**Mərhəmətli, Rəhimli olan Allahın adı ilə**

Həqiqətən, şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

***"Ey iman gətirənlər! Allahdan lazımınca qorxun və ancaq müsəlman olduğunuz halda ölün!"***

***"Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan da onun üçün zövcə (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadın (törədib yer üzünə) yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan qorxun və qohumluq əlaqələrini***

***kəsməkdən (həzər edin)! Həqiqətən, Allah sizə Nəzarət edəndir!"***

***"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (Əgər belə etsəniz) Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Onun elçisinə itaət etsə, böyük bir səadətə nail olar".***

Şəkk yoxdur ki, Quranla müalicə etmək fayda verən müalicə və tam şəfadır. Uca Allah buyurur: ***"O, iman gətirənlərə doğru yol göstərən rəhbər və şəfadır"***. Başqa bir ayədə buyurur: " ***Biz Quranda möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik"***.

İbn Qeyyim ***(Allah ona rəhmət eləsin)*** dedi: "Bir müddət Məkkədə qaldım. Xəstələndiyim zaman nə həkim, nə də ki, dərman tapırdım. Özümü "Fatihə" surəsi ilə müalicə edirdim və onun qəribə təsirini görürdüm. Zəmzəm suyunu götürüb içərisinə (Quran) oxuyur, sonra içirdim. Beləliklə, tam olaraq sağalırdım."

Ovsun sığınmaq, qorunmaq mənasını verən kəlmədir. Həmçinin ovsun "ruqya" kəlməsi ilə də ifadə olunur. Ovsun əslində fars sözüdür.

Ovsun ilə müalicə etmək hələ İslam dini gəlməzdən əvvəl cahilliyə dövründə yaşayan ərəblərdə və Kitab əhlində belə mövcud idi.

Abdullah ibn Abbas ***(Allah onlardan razı olsun)*** rəvayət edir ki, Əzdi-Şənuə qəbiləsindən olan Dimad cin vurmuş adamları ovsunla müalicə edirdi. O, Məkkəyə gəldikdə oradakı səfehlərin: "Muhəmməd dəli olub, onu cin vurub"- dediklərini eşitdi və öz-özünə dedi: "Gərək gedib bu adamı görüm. Bəlkə Allah mənim əlimlə ona şəfa verdi!" O, Muhəmmədin ***(Allahın ona salavat və salamı olsun)*** yanına gəlib dedi: "Ey Muhəmməd! Mən bu xəstəliyi müalicə edə bilərəm. Allah mənim əlimlə istədiyinə şəfa verir. Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** dedi: *"Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edir, Onu köməyə çağırırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir."* Dimad ondan dediklərini təkrar söyləməyini xahiş etdi.

Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** dediklərini təkrar etdi. Dimad yenə xahiş etdi. Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** bunu üçüncü dəfə təkrar etdikdən sonra Dimad dedi: "Mən həm kahinlərin, həm sehrbazların, həm də şairlərin sözlərini eşitmişəm. Lakin sənin söylədiklərinə bənzərini eşitməmişdim. Sənin sözlərin dənizin ta ortasına gedib çatdı. Ver əlini, İslam dinini yaşayıb-yaşadacağıma dair sənə beyət edim...".

Ovf ibn Məlik əl-Əşcai ***(Allah ondan razı olsun)*** rəvayət edir ki "cahillik dövründə ruqya etdiyimizi Peyğəmbərə ***(Allahın ona salavat və salamı olsun)*** bildirib soruşduq: "Ey Allahın elçisi! Bu barədə nə deyə bilərsən?" O ***(Allahın ona salavat və salamı olsun)*** *"Etdiyiniz ruqyanı mənə söyləyin. Şirk olmayan ruqyaləri etməkdə heç bir qəbahət yoxdur"* – deyərək cavab verdi. Başqa bir hədisdə isə buyurulur: *"Sizlərdən biriniz qardaşına kömək edə bilirsə etsin".*

**Ovsunla şəriətin bağlılığı**

Ovsunun şəriətlə bağlı bəzi məsələləri vardır.

Birincisi: Bəzi ovsunlarda Allahdan qeyrisinə sığınmaq və Allahdan qeyrisindən kömək diləmək kimi İslam əqidəsinə müxalif olan şeylər vardır. Belə ki , bu cür şeylər ovsun edən və ediləni  şirkə aparan bir yoldur. Bu ruqyanin şirk olmasını Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** bizə xəbər vermişdir. Abdullah ibn Məsud ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** demişdir: *"Ovsun, tilsim və cadu şirkdir"*. Çünki bu əməl tovhidin əslinə ziddir.

İkincisi: Bəzi insanlar tam olaraq ovsuna bağlanır və elə zənn edirlər ki, ovsun özü təsir edən bir qüvvədir və təsir edir. Əslində isə ovsun Allahın qüdrəti və istəyi olmadan təsir edə bilməz. Ovsun bir səbəbdir, çünki istədiyinə şəfa verən yalnız Allahdır. Uca Allah bu barədə İbrahim peyğəmbərinin ***(Allahın ona salamı olsun)*** buyurur: "***O Rəbb ki, xəstələndiyim zaman mənə şəfa verir"***.

**Ruqya təvəkkülü inkar edirmi?**

Bəzi alimlər ovsun ilə müalicə etməyin hökmünü məkruh görüblər. Hətta imam Buxari öz "Səhih" əsərində ovsun etməmək barəsində fəsil belə qeyd etmişdir.

Bu rəydə olan alimlər aşağıdakı hədisi əsas gətirirlər. Huseyn ibn Abdur-Rahman ***(Allah ona rəhmət eləsin)*** belə rəvayət edir ki: "mən Səid ibn Cubeyirin yanında olarkən o dedi: "Sizlərdən kim bu gecə batan ulduzu gördü?". Dedim: "Mən". Sonra dedim: "Doğrusu mən o vaxt namaz qılmırdım, məni əqrəb sancmışdı". O: "Bəs nə etdin?" - deyə soruşdu. "ovsun oxudum"- deyə cavab verdim. O dedi: "Buna səni nə vadar etmişdi? Dedim: "Şabinin bizə danışdığı hədis". O: "O sizə hansı hədisi danışıb" - deyə soruşdu. Dedim: "O bizə Bureyd ibn Huseybdən ***(Allah ondan razı olsun)*** Peyğəmbərin ***(Allahın ona salavat və salamı olsun)*** belə dediyini rəvayət etmişdir. "Ovsunla yalnız bədnəzər toxunana, (ilan və əqrəb) sancana əlac etmək olar". O dedi: "Eşitdiyinə əməl edənə əhsən. Lakin Abdullah ibn Abbas ***(Allah onlardan razı olsun)*** bir dəfə bizə Peyğəmbərin ***(Allahın ona salavat və***

***salamı olsun)*** belə dediyini rəvayət etmişdir. *“Mənə ümmətlər göstərildi. Mən elə Peyğəmbər gördüm ki, yanında bir dəstə (on nəfərə qədər) adam, eləsini gördüm ki, yanında bir-iki adam vardı, eləsini də gördüm ki, yanında heç kəs yox idi. Bu zaman mənə böyük bir kütlə göründü. Mən elə zənn etdim ki, bu, mənim ümmətimdir. Lakin mənə səda gəldi: “Bu Musa və onun qövmüdür”. Yenə baxdım və (əvvəlkindən daha böyük) başqa böyük bir insan toplusu gördüm. Mənə səda gəldi ki, bu sənin ümmətindir. Onların arasında yetmiş min adam var ki, haqq-hesabsız və əzabsız Cənnətə düşəcəklər”.* Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** bunu deyib mənzilinə daxil oldu. Camaat bu yetmiş min nəfərin kimliyi barədə fikir yürütməyə başladılar. Bəzisi dedi ki, ola bilsin onlar Allahın elçisinin ***(Allahın ona salavat və salamı olsun)*** sirdaşlarıdır. Bəzisi də dedi ki, bəlkə də onlar İslam bərqərar olduqdan sonra anadan olmuş və heç nəyi Allaha şərik qoşmayan adamlardır. Hərə bir fikir söylədi. Bu zaman Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** onların qarşısına çıxdı və ondan bu barədə soruşdular.

Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** dedi: *“Onlar elə adamlardır ki, ovsun oxutmur, dağlamaqla müalicə etdirmir, bədbinlik etmir və yalnız Rəblərinə təvəkkül edirlər”.* Ukkəşə bin Mihsan ***(Allah ondan razı olsun)*** ayağa qalxdı və dedi: “Allaha dua et ki, mən onlardan olum”. Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** dedi: *“Sən onlardansan”*. Sonra başqa biri ayağa qalxdı və dedi: “Mənim də onlardan olmam üçün dua et”. Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** buyurdu: *“Ukkəşə səni qabaqladı”*.

Bəzi alimlər bu hədisi əsas götürərək ovsunun, dağlamanın və həmçinin dərmanlarla tədavi olmanın hökmünün məkruh olmasını qeyd etmişlər. Çünki yuxarıdakı hədisin Muslimdəki rəvayətində “ovsun oxutmur” yox “ovsun etməzlər” kimi zikr olunmuşdur. Ancaq bu barədə olan hədisləri cəm etdikdə Şeyxul-İslam İbn Teymiyyənin ***(Allah ona rəhmət eləsin)*** dediyi kimi Muslimdəki hədisdə ravinin xəta etdiyi aydın olur (yəni "ovsun etməzlər" ləfzi). Çünki Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** özü, Cəbrail ***(Allahın ona salamı olsun)*** və səhabələr ***(Allah***

***onlardan razı olsun)*** ovsun edərdilər. Əgər ovsun etmək təvəkkülə zidd olsaydı, Cəbrail ***(Allahın ona salamı olsun)*** bunu etməzdi. Həmçinin də Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** bunu qəbul etməzdi. Çünki Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** təvəkkül edənlərin seyyidi idi. Hətta Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** ovsun etməyi səhabələrə əmr belə edərdi. Aişə ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** göz dəymədən ovsun etməyi mənə əmr edərdi. Məhz buna görə Allahın izni ilə ovsun etmək fayda verir.

**Nəticə**: İnsanın özü-özünə və ya başqalarına ovsun etməsi təvəkkülə zidd olan hərəkət deyildir. Ovsunun təvəkkülə zidd olan, bəyənilməyən növü isə onu insanlardan tələb etməkdir.

## Dərmanlarla müalicə etməyin hökmü

Peyğəmbərdən ***(Allahın ona salavat və salamı olsun)*** rəvayət olunan hədislərdə dərmanlarla müalicə olunmaq və onun əksinə dair səhih hədislər varid olmuşdur. Əbu Hureyrə ***(Allah ondan razı olsun)***

rəvayət edir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** demişdir: *"Uca Allah elə bir xəstəlik endirməyib ki, onun dərmanını da endirməsin"*. Usəmə ibn Şureyk ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, Peyğəmbərin ***(Allahın ona salavat və salamı olsun)*** yanında olarkən ərəblər gələrək Peyğəmbərə ***(Allahın ona salavat və salamı olsun)*** dedilər: "Ey Allahın elçisi, müalicə alaqmı?". Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** dedi: *"Bəli. Ey Allahın qulları müalicə alın. Həqiqətən Allah elə bir xəstəlik göndərməyib ki, onun şəfasını da göndərməsin. Yalnız bir xəstəlikdən başqa"*. Səhabələr onun nə olduğunu soruşdular. Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)***: *"ölüm"* – deyə buyurdu.

Həmçinin müalicəni tərk etmək barədə Peyğəmbərdən ***(Allahın ona salavat və salamı olsun)*** bir çox hədislər varid olmuşdur. Necə ki, bir qadın gələrək xəstəliyindən şikayət etdikdə Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** buyurur: *"İstəyirsən səbr et, Cənnətə düşərsən, istəyirsənsə də sənə dua eləyim ,sağalasan"*.

Bu cür hədislər varid olduğu üçün alimlər müalicə almağın hökmündə ixtilaf etmişlər.

Bəziləri mübah, bəziləri sünnə, bəziləri vacib, bəziləri isə tərk etməyin daha əfzəl olduğunu söyləmişlər.

Allah doğrusunu daha yaxşı bilir. Mənə görə isə daha düzgünü, xəstəliklər biri-birindən fərqlənir. Əgər xəstəlik həkimlərin qoyduqları diaqnoza və ediləcək müalicəyə görə xəstəliyi məhv olmağa apararsa və müalicəyə görə keçib gedəcəksə, o zaman Allaha təvəkkül edərək dərmanlardan səbəb kimi istifadə etmək labüddür. Necə ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** Uhud döyüşündə yaralandıqda, eləcə də səhabələri başqa döyüşlərdə yaralandıqda müalicə alardılar. Onlardan heç biri Allaha təvəkkül edərək səbəb götürmədən xəstəlikdən qurtulacağını gözləmirdilər. Bu yuxarıda qeyd etdiyimiz kimi məhvə aparan xəstəliyə aiddir.

Dərmanı səbəb götürdükdən sonra Allaha təvəkkül edərək müalicə almaq təvəkkülə zidd deyildir. Şəriətin qadağan etmədiyi səbəblərin hamısından istifadə etməkdə heç bir qəbahət yoxdur. Hər bir şeyin səbəbi olduğu kimi xəstəliklərdən də qurtulmağın səbəbləri vardır.

Od yanğın, bıçaq kəsmək, yemək aclığı aparmaq üçün səbəb olduğu kimi, Allah şəfa versin deyə xəstələndikdə səbəbləri götürməkdə dinə müxalif bir şey yoxdur.

**Şəriətin icazə verdiyi ovsun**

Şəriət bəzi şərtlər olduqda ovsun eləməyə icazə verir. İbn Həcər ***(Allah ona rəhmət eləsin)*** demişdir: "Üç şərt olduğu halda alimlər ovsunun caiz olmasında ittifaq etmişlər. Birincisi; Allahın kəlamları, ad və sifətləri ilə olmalıdır. İkincisi; ərəb dilində və mənası başa düşülən sözlərlə olmalıdır. Üçüncüsü; etiqad etməlidir ki, ovsun özü heç bir təsir göstərmir. Şəfa verən isə Uca Allahdır.

İbn Həcərin ***(Allah ona rəhmət eləsin)*** qeyd elədiyi alimlərin ittifaqı, "Səhih əl-Buxaridə" varid olan Cənnətə sorğu sualsız girən yetmiş min nəfər hədisinə müxalif deyildir. Hədisdə qeyd olunur ki, onlar bədbinlik, dağlamaqla müalicə etdirmir, ovsunu tələb etməzlər və Rəblərinə təvəkkül edərlər. Ovsunu tələb etməklə ovsun

etmək arasında fərq vardır. Dinimizdə bəyənilməyən ovsunu tələb etməkdir.

Ovsunun caiz olmasına aid hədislərin sayı çoxdur. Aişə ***(Allah ondan razı olsun)*** dedi: "Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** yatağına girdikdə əllərinə üfürərək "İxlas, əl-Fələq və ən-Nəs" surələrini oxuyar, sonra əllərini üzünə və bütün bədəninə sürtərdi".

Əbu Səid əl-Xudri ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, bir dəfə biz səfərə çıxdıq. Gəlib bir vahəyə (yaşıllıq olan bir yerə) çatdıq. Oranın sakinlərindən birini əqrəb sancmışdı. Bu vaxt bir kəniz bizim yanımıza gəlib: "Aranızda ovsunla müalicə edən bir kimsə varmı? Vahədə yaşayanlardan birini əqrəb sancmışdır!"– dedi. Səhabələrdən biri qalxıb xəstənin yanına getdi. Biz onun ovsunla müalicə etdiyini bilmirdik. O, xəstəyə "əl-Fatihə" surəsini oxuduqdan sonra xəstə sağaldı. Bunun müqabilində ona otuz qoç verdilər. O ,bu qoçları bizim yanımıza gətirdi. Biz ondan: "Sən ovsunmu oxudun?"– deyə soruşduq. O: "Mən Kitabın anasını oxuyub onu müalicə etdim!"– deyə cavab verdi. Səhabələr

dedilər: “Peyğəmbərdən ***(Allahın ona salavat və salamı olsun)*** soruşanadək (*buna dair)* heç bir hökm verməyin!” Biz Mədinəyə – Peyğəmbərin ***(Allahın ona salavatı və salamı olsun)*** yanına gəldikdə bu hadisəni ona danışdıq. Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** dedi: *“O nə bilirdi ki, əl-Fatihə surəsini oxuyub xəstəni müalicə etmək olar?! O qoçları bölüşdürün və mənə də bir pay ayırın”.* Bu hədis dəlalət edir ki, qeyri müsəlmanları belə ovsunla müalicə etmək və onun müqabilində hədiyyə almaq caizdir.

**Ovsunun növləri**

Ruqya özü iki qismə bölünür.

Birinci: Bəla baş verməzdən öncə edilən ovsun. Abdullah ibn Abbas ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** Həsən və Hüseyini ***(Allah onlardan razı olsun)*** qorumaq üçün deyərdi: *“Hər bir şeytandan, zərərli həşəratdan və hər bir pis gözdən qorumaq üçün sizi Allahın tam kəlmələrinə həvalə edirəm”.* Osman ibn Əffan ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)***

demişdir: *"Kim günün əvvəlində və gecəsində "Allahın adı ilə! Hansı ki, adı çəkildikdə yerdə və göydə heç bir şey zərər verə bilməz. O, Eşidəndir, Biləndir" üç dəfə deyərsə həmin gün və ya gecə heç bir şey ona zərər verməz".* Buna aid dəlillər hədislərdə çox varid olmuşdur.

İkincisi: Bəla üz verdikdən sonra edilən ruqya. Cəbrail ***(Allahın ona salamı olsun)*** Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** xəstələndiyi zaman ona ovsun oxuyardı. Həmçinin Aişə ***(Allah ondan razı olsun)*** deyir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** əhlindən birinin xəstələndiyini gördükdə "Fələq və ən-Nəs" surələrini oxuyardı. Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** vəfat etməzdən əvvəl xəstələndiyi zaman mən də oxuyar və öz əlləri ilə bədəninə sürtərdim. Çünki onun əlləri mənim əllərimdən daha bərəkətli idi.

## Ovsunun şərtləri

Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** ovsunun şərtlərini bizə bəyan etmişdir. Bunlardan mühümlərini qeyd edək:

Birincisi: Ovsunda şikr olmamalıdır. Ovf ibn Məlik əl-Əşcai ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, cahillik dövründə ruqya etdiyimizi Peyğəmbərə ***(Allahın ona salavat və salamı olsun)*** bildirib soruşduq: "Ey Allahın elçisi! Bu barədə nə deyə bilərsən? O: ***(Allahın ona salavat və salamı olsun)*** *"Etdiyiniz ruqyanı mənə söyləyin. Şirk olmayan ruqyaləri etməkdə heç bir qəbahət yoxdur"* – deyərək cavab verdi. O ovsun ki, onda şirkə yol verən kəlmələr var o ovsunu etmək qadağandır. Allah və rəsuluna inanan hər bir kəs belə ovsunlardan uzaq olmalıdır. Məxluqlardan kömək istənilən hər bir ovsun şirk olunan ovsun adlanır. Uca Allah buyurur: *"**Allahı qoyub, sənə nə bir fayda, nə də bir zərər verə bilməyən şeylərə yalvarma. Əgər belə etsən, sözsüz ki, zalımlardan olarsan**"*.

Muhəmməd peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** insanların ən şərəflisi olmasına baxmayaraq Uca Allah ona əmr edir ki, insanlara desin: *"**De: "Mən yalnız öz Rəbbimə dua edirəm və kimisə Ona şərik qoşmuram!" De: "Mən sizə nə ziyan verməyə, nə də (sizi) doğru yola yönəltməyə qadirəm!" De: "Həqiqətən, məni***

***Allahdan kimsə xilas edə bilməz və mən Ondan başqa bir pənah yeri tapa bilmərəm!"***.

Əgər bu bəşəriyyətin ən xeyirli insanının halıdırsa, bəs onda adı insanların halı necə olar?!

İkincisi: Ovsunda sehr olmamalıdır. Uca Allah bu əməlin haram, küfr olduğunu bəyan etmişdir. Uca Allah buyurur: ***"Onlar Suleymanın səltənətində şeytanların oxuduqlarının ardınca getdilər. Süleyman kafir olmadı. Lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanı insanlara öyrədərək kafir oldular. Mələklər: "Biz ancaq bir sınağıq, sən gəl kafir olma!"– deməmiş onu heç kəsə öyrətmirdilər. Yəhudilər ərlə arvadı bir-birindən ayıracaq işləri onlardan öyrənirdilər. Lakin onlar Allahın izni olmadan heç kəsə zərər verə bilməzlər. Onlar özlərinə zərər verən, faydası olmayan şeyləri öyrənirdilər. Onlar bilirdilər ki, onu əldə edən kimsə üçün axirətdə heç bir pay yoxdur. Nəfslərinin əvəzində satın aldıqları şey necə də pisdir! Kaş bunu biləydilər!"***. Digər bir ayədə bu əməlin haram olmasını bəyan edərək

buyurur: " ***Sehrbaz isə, hara gedirsə-getsin, uğur qazanmaz***". Əbu Hüreyrə ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** demişdir: *"Məhvedici yeddi günahdan çəkinin!" (Səhabələr)* soruşdular: "Onlar hansılardır, ya Rəsulallah?" Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** buyurdu: *"Allaha şərik qoşmaq, sehrbazlıq, Allahın haram buyurduğu cana nahaq yerə qəsd etmək, sələm yemək, yetimin malını mənimsəmək, döyüş meydanından qaçmaq və zinadan xəbəri olmayan namuslu, ismətli mömin qadınları zinada ittiham etmək"*.

Üçüncüsü: Ovsun edən kəs kahin və ya fala baxan olmamalıdır. Çünki kahin, fala baxanın nə yanına getmək nə də onu təsdiq etmək olar. İmran ibn Huseyn ***(Allah ondan razı olsun)*** rəvayət edir ki, Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun)*** demişdir: *"Kim kahinin və falçının yanına gedib onun dediklərini təsdiq edəsə, Muhəmmədə nazil olana küfr etmiş olar!"*.

Dördüncüsü: Ovsun açıq-aydın ibarələr və mənası başa düşülən sözlərlə olmalıdır. Mənası başa düşülməyən sözlərdən olan ovsunu etmək

olmaz. İbn Həcər *(Allah ona rəhmət eləsin)* demişdir: "Alimlər üç şərt olduqda ovsun etməyə icazə vermişlər. 1. Allahın kəlamı və ya Allahın ad və sifətləri ilə olmalıdır. 2. Ərəb dilində və mənası başa düşülən olmalıdır. 3. Etidaq edilməlidir ki, ovsunun özü heç bir təsir etmir. Yalnız Uca Allah təsir edir".

Beşincisi: Ovsun edən kəs haram heyətdə olmamalıdır. Yəni cununblu, hamamda, qəbristanlıqda və ya övrəti açıq halda və s. haram hallarda olmamalıdır.

Altıncısı: Ovsun haram olan kəlmələrdən ibarət olmamalıdır. Lənət, söyüş və s. kimi kəlmələrdən olmamalıdır.

Yeddincisi: Ovsun edən də, edilən də ovsunun nə fayda nə də zərər verdiyini etiqad etməlidir. Dua, ovsun müsəlmanın silahı yerindədir. Silah özü təklikdə heç bir şeyə qadir olmadığı kimi ,ovsun da özlüyündə heç bir fayda verə bilməz.

## Ovsun barədə bəzi qeydlər

İndiki zamanda xəstə olanlara ovsun etmək elm tələbələri arasında geniş yayılmışdır. Hətta

bəzi elm tələbələri artıq ovsun etməklə şöhrətlənmişlər. Xəstəxanalarda olduğu kimi xəstələrə vaxt təyin edərək onların gəlişi üçün hazırlıq görür və hətta onlardan pul alaraq bunu özlərinə sənət seçmişlər. Lakin bu əməli sənətə çevirməyin bir çox fəsadları vardır.

a) Düzdür, Uca Allah qeyd etdiyimiz şərtlər olduqda ovsunla müalicə etməyi, hətta əvəzində nə isə almağı belə icazə vermişdir. Lakin bu əməli nə Peyğəmbər ***(Allahın ona salavat və salamı olsun),*** nə bir səhabə, nə də ki, sələfilərdən kimsə sənətə çevirmiş ,nə də ki ,onlardan heç kim buna görə insanlar arasında tanınmamışdır. Demək bu əməli sənətə çevirmək bidəət qapısını açmaq deməkdir.

b) Avam insanlar elə zənn edirlər ki, ovsun edən şəxs hansısa bir xüsusiyyətə malikdir ki ,bu da insanlar arasında "vergi verilib" kəlməsi ilə məşhurdur.

c) Həmçinin şeytan bu cür insanlara özləri də bilmədən kömək edir (yəni cin özü qəsdən həmin şəxsi ovsun etdikdən sonra xəstəni tərk edir) və həmin şəxs insanların etibarını qazanır.

Bu insanların Allaha olan təvəkkülünü azaltmaqla yanaşı, həmin şəxs barədə yuxarıda qeyd etdiyimiz kimi fikirlər yaradır. Hərdən şeytan insanlara elə tələlər qurur ki, yalnız onu alimlər anlaya bilirlər. Abdullah ibn Məsudun ***(Allah ondan razı olsun)*** zövcəsi ona dedi: "Gözlərim səyridiyi üçün filan yəhudinin yanına getdim, o da, ovsun oxudu. O, ovsun oxuduqda gözlərimin səyriməyi keçib-getdi." Abdullah ibn Məsud ***(Allah ondan razı olsun)*** dedi: "Bu ancaq şeytan əməlidir. O şeytan ki, gözə barmağ edir, (o yəhudi) ovsun oxuduqda isə əlini çəkir".

d) Bəzi səhabələr dua etdikdə dualarının qəbul olması ilə məşhur idilər. Səid ibn Əbu Vaqqas, cənnətlə müjdələnən on nəfər səhabə və yaxud Peyğəmbərin ***(Allahın ona salavat və salamı olsun)*** dua etdiyi təbiinlərdən olan Uveys əl-Qarni kimi insanlar dua etdikdə qəbul olurdu. Lakin insanlar bunu bildiklərinə baxmayaraq, onların yanına gedib dua etmələrini tələb etməzdilər.

e) Həmçinin ovsun edən şəxsin sələfilərin məşhur olmadığı yolla məşhur olmasına gətirib

çıxarır. Bu da şeytanın qapılarından birini açır.

**QEYD:** Əlinizdəki kitab insan əməyinin bəhrəsidir və ona görə də orada xətaların olması labüddür. Hər hansı bir xəta ilə üzləşdikdə və ya mövzu ilə bağlı daha maraqlı təklifiniz olarsa, ramil.soltanov@gmail.com elektron ünvanına yazmanızı xahiş edirik.